**Dr. Qədirova Dürdanə**
Azərbaycan Milli Xalça Muzeyi
**Dr. Telman İbrahimov**
Azərbaycan Milli Elmlər Akademiyası

## AZƏRBAYCANIN QEYRİ-ƏJDAHALI XALÇALARINDA ƏJDAHA TƏSVİRLƏRİ BARƏDƏ

### GİRİŞ



Məlumdur ki, "Əjdahalı" xalçaların əksəriyyəti Qafqaz və Qarabağ mənşəlidir. Lakin, Azərbaycanın digər bölgələrindən olan xalçaların dizaynında da əjdaha təsvirlərinin olması hamı üçün bəlli deyil. Azərbaycanın Şirvan, Quba, Qazax, Zəngəzur və s. regionlara aid ornamental xalçalarda əjdaha motivinin çoxsaylı variantlarına və üslublaşdırılmış təsvirlərinə rast gəlinir. Belə xalçalardakı əjdaha təsvirləri əjdaha motivinin qeyri-adi və son dərəcə maraqlı folklor variantlarıdır. Azərbaycan Milli Xalça Muzeyinin kolleksiyasında çoxlu sayda belə qeyri-əjdahalı, əjdaha təsvirli ornamental xalçalar var.

Azərbaycanın bu cür ornamental xalçalarında əjdaha motivi, daha əvvəllər bir qayda olaraq, əsas deyil, magik kontekstdə, ikinci dərəcəli kiçik motiv kimi təsvir olunaraq evi, ocağı, ailəni şərdən, bəd nəzərdən qoruyan sehrli talisman rolunu oynamış və sonralar isə xalçanın bəzəyi kimi çıxış etmişdir. Orta əsr feodal hakimiyyətinin möhkəmlənməsi və dövlətçiliyin formalaşması ilə əlaqədar olaraq, xalçalarda olan bu əjdaha təsvirlərinin iki funksiyasına üçüncü də əlavə olunur – dövlət hökmdarının gücü və qüdrəti böyük saray xalçalarında əjdahaların təsvirləri vasitəsilə ifadə olunur.

Mistik əjdahanın qoruyucu gücünə xalqın arxaik inamı ilə yanaşı, hətta onun şəklinin də evə qoruması, uğur və maddi rifahı "cəlb etməsi" inamı da var idi. Azərbaycanlıların mədəni yaddaşına dərin nüfuz edən, qədim köklərə malik Əjdaha obrazının sehrli gücü və inamı o qədər güclü, universal idi ki, onun təsviri ənənəvi olaraq dizaynından asılı olmadan, demək olar ki, bütün xalçalarda yerləşdirilib.

### ƏJDAHALARIN FOLKLOR VƏ ƏDƏBİ OBRAZLARI AZƏRBAYCAN XALÇALARINDA



XVI-XIX (20 nəsrin əvvəlləri) əsrlərdə Azərbaycanın bütün bölgələrində toxunmuş həm xovsuz, həm də xovlu xalçalarda əjdaha təsvirlərinə rast gəlinir. Bu dövrdə Azərbaycanda toxunan bütün ənənəvi xalçalar bədii-texniki xüsusiyyətlərinə əsasən tədqiq edilərək dörd tipoloji qrupa bölünür. Bu qrupların tipoloji fərqləri araşdırılaraq xalqın, etno-tayfanın və ya coğrafi ərazidə formalaşmış tarixi və yerli ənənələrə əsasən müəyyən edilir. Bu tipoloji qruplar aşağıdakılardır: "Quba-Şirvan-Bakı qrupu", "Qarabağ-Zəngəzur qrupu",

“Gəncə-Qazax-Borçalı qrupu” və Cənubi Azərbaycannın “Təbriz-Ərdəbil qrupu”. Tarixən bu ərazilərdə yaşayan azərbaycanlılar tərəfindən toxunan bütün xalçalar ümumi toxuculuğa xas, məlum xususiyyətlərə malik olsalar da, xalça qruplarının öz tarixi, yerli səciyyəvi üslub xüsusiyyətləri də var. Bu ümumi üslub xüsusiyyətlərinin yaranmasında etnik azlıqlardan olan ləzgilər, avarlar, kürdlər, tatlar, dağ yəhudiləri, talışlar və digər toxucular da öz töhfələrini vermişlər. Ortaq siyasi, coğrafi, tarixi, millətlərarası sıx bağlılıqlar, qonşu etnik qruplar arasında ticarət, mədəni əlaqələri ümumi milli mənsubiyyətin formalaşmasına və nəticədə xalçaçılıq sənətinin ümumi bədii-texniki xüsusiyyətlərinin formalaşmasına səbəb olmuşdur.

Qərb mütəxəssisləri müasir siyasi coğrafiyaya görə Qafqazda və Şimal-Qərbi İranda toxunan Azərbaycan xalçalarını “Qafqaz” və “Fars” xalçalarına bölürlər. Bu mütəxəssislər 19-cu əsrdə rus-fars müharibəsi nəticəsində Azərbaycan xalqının və onların yaşadığı ərazinin Fars və Rusiya imperiyaları arasında iki yerə bölünməsini nəzərə almırlar. Bu bölgü hamı üçün siyasi və hüquqi statusa malikdir, lakin azərbaycanlılar üçün deyil. Azərbaycanlılar üçün onları ayıran müasir siyasi sərhəd şərtidir, çünki onlar ümumi mədəni və tarixi ənənələrə malik bir xalqdır.

Ənənəvi olaraq Azərbaycan xalılarının Qafqaz xalça qrupu motivləri sxematik və həndəsi üslubu ilə xarakterizə olunur. İran Azərbaycanı xalçaları isə bitki motivlərinin daha yüksək reallığı ilə seçilir. Lakin şəhər xalçaları üçün nəbati motivli dizaynlar daha xarakterikdir. Şimal-Qərbi İranın (İran Azərbaycanı) qəbilə xalçaları Qafqaz Azərbaycanı xalçaları ilə eynidir. Bu eyniliyi bir çox naxışların ümumiliyində və motivlərinin həndəsi üslubunda görmək olar.

Əjdaha motivi Azərbaycan xalçalarında əsasən iki fərqli ikonoqrafik üslubda yayılmışdır: İran Azərbaycanının erkən Səfəvi saray xalçalarında əjdaha motivi fiqurativ obrazlılığı və realist təsvir tərzi ilə səciyyələnir. Bu əjdahanın ikonoqrafiyası Şərq poeziyası klassiklərinin (Firdovsi, Gəncəvi, Fəridəddin Əttar, Cami, Hafiz və s.) əlyazma kitablarını bəzəyən miniatür təsvirlərdəki məşhur əjdaha obrazlarından irəli gəlir. Bu müəlliflərin əsərlərində ədəbi qəhrəmanın əjdaha ilə mübarizəsi süjetləri var. Əlyazma kitablara miniater təsvirli illüstrasiyalar çəkən saray rəssamlarının iştirakı ilə əjdahalar əvvəlcə texniki təsvirlərə(çeşni), sonra isə “Əjdahalı” xalçalara “köçmüşlər”.

Klassik ədəbiyyatda və əlyazma kitablarının miniatürlərində əjdaha əmüsbət ədəbi qəhrəmanı məhv etmək şər məxluq kimi təsvir edilirdi. Mənfi əjdaha obrazı Səfəvilər dövrü saray emalatxanalarında toxunan təsvirli xalçalarda bərqərar olmuşlar. Əjdaha obrazına belə mənfi münasibət əsasən ədəbi əsərlərlə tanış olan saray kübarları arasında geniş yayılmışdı. Yazı savadı və bahalı əlyazma kitablarına çıxışı olmayan sadə xalqın öz əjdaha obrazı var idi ki, bu da məşhur inanclara, miflərə və nağıllarla bağlıdır. Bu miflərdə əvvəlcə mənfi, qorxunc və şər qüvvə olan əjdaha, sonralar yaxşılıq və ədalət uğrunda mübarizə aparan qəhrəmanla qarşılıqlı münasibət nəticəsində onun köməkçisinə və himayəçisinə çevrilmişdir.

16-cı əsrin ortalarından başlayaraq saray xalçalarında əjdahaların təsvirinin obrazlı ənənəsi getdikcə öz yerini əjdahaların stilizə edilmiş, ornamental təsvirlərinə verdi.

Qəhrəmanın əjdaha ilə döyüşünün əvvəlki obrazlı motivi yeni, daha şərti və stilizə olunmuş motivə - "Əjdaha və Simurq" obrazına çevrilir. Yeni obraz, motiv ədəbi ənənənin köhnə narrativindən – əsatirlərindən azad idi.

Onu da qeyd etmək lazımdır ki, Şərq xalçaları mütəxəssisləri arasında "Əjdaha və Simurq" motivinin, bu iki obrazın mübarizəsini əks etdirməsi barədə yanlış fikirlər mövcuddur. Səbəb odur ki, köhnə ədəbi motivin məzmunu – qəhrəmanın əjdaha ilə döyüşü "Əjdaha və Simurq" xalça motivinin məzmununa "mexaniki" olaraq proyeksiya – köç edilmişdir.

Bununla belə, XV əsr Berlin xalçasında "Əjdaha və Simurq" motivinin ən erkən təsvirindən tutmuş Səfəvilərin son dövr xalçalarına qədər elə bir əsər yoxdur ki, "Əjdaha və Simurq" motivi qəti olaraq birmənalı şəkildə döyüş səhnəsi kimi şərh olunsun. Bu motivdə aydın, dəqiq mübarizə əlamətləri varmı? Mübarizə yoxdur, tarazlıq, harmoniya yaradan qarşı–qarşıya durma var. "Əjdaha və Simurq" dinc yanaşı yaşayan, səmada və həyatda kişi və qadın prinsiplərinin harmoniyasını simvollaşdıran ornamental motivi (diskurs) ifadə edir. Bununla belə, ədəbi stereotiplər o qədər güclüdür ki, məzmunun "mexaniki" ötürülməsi də baş verir.

Səfəvi saray xalçalarında əjdahaların təsvirinin məzmunu, ikonoqrafiyası və üslubu 1642-ci ildə yeni hökmdar Şah Abbas Səfəvinin (Böyük) hakimiyyətə gəlməsi ilə dəyişdi. Şah Abbasın Avropaya satılan ticarət xalçalarının istehsalında apardığı geniş islahatlar hamıya məlumdur. Bəzi xalça nümunələrinin yaradılmasında Şah Abbasın şəxsən iştirak etdiyi də məlumdur. Rəvayətə görə, Qarabağ "Əjdaha xalçaları"ndakı heraldik əjdahalar tərəfindən qorunan məşhur "Həyat çiçəyi" motivi şəxsən Şah Abbas tərəfindən yaradılmış və xalça tarixində "Şah Abbasi" gülü/motivi adı ilə tanınır.

Böyük Səfəvi xalçalarının kommersiyalaşdırılması layihəsi Avropa ölkələri ilə çiçəklənən ticarətlə bağlı idi. Xalçaların ticarət məqsədli istehsalı dizaynların və əsas motivlərin birləşdirilməsini nəzərdə tuturdu. Bu unufikasiya toxucuların buraxdıqları səhvləri aradan qaldırdı, bu da xalçaların keyfiyyətinin və məhsuldarlığının yüksəlməsinə səbəb oldu. Düzdür, motivləri yaxşı bilməyən toxucular bəzən yenə də xalçaya öz subyektiv və ya təhrif olunmuş elementlərini əlavə edirdilər. Lakin bütövlükdə xalçanın dizaynı saray rəssamının texniki rəsmdə (çeşnidə) və ya nümunə olan xalça fraqmentində ("Örnək" – nümunə) təyin etdiyi ümumi ikonoqrafik kanon daxilində qalmışdır.

Sarayın məqsədi Səfəvi xalçalarında əjdaha motivinin yenidən təfsirinə səbəb olmuşdur. İndi qədim əjdaha motivi ali gücü simvolizə etməyə başladı. Bu yenidən şərhə Avropa ölkələri ilə artan siyasi, mədəni və iqtisadi əlaqələrə təsir etdi. Avropa monarxiyalarının gerblərində, kral taclarında şir, qartal və digər heyvanların heraldik təsvirlərin olması "Həyat çiçəyi"nin kənarlarında heraldik əjdaha təsvirləri olan Səfəvi xalçası "gerbinin" yaradılmasına səbəb olmuşdur (Şah Abbasi çiçəyi).

Onu da qeyd edək ki, əjdaha motivinin bu simvolizmi və funksionallığı Çin mədəniyyətində paralellərə malikdir, burada əjdaha həm də ali imperiya gücünü təcəssüm

etdirir. Göründüyü kimi, Səfəvi və Çin xalçalarının rəsmi/saray simvolikasının oxşarlığı ona təsir göstərmişdir ki, şərq xalçaları üzrə bəzi avropalı mütəxəssislər Səfəvi əjdaha motivinin "Çin kökləri" olduğuna qərar vermişlər. Qəribədir ki, bu motivlərin həm obraz semantikasında, həm də obrazının ikonoqrafiyasında əsaslı fərqlərə malik olmasına heç kim fikir vermir. Eyni zamanda, unutmaq olmaz ki, əjdaha obrazının məzmunu və lokal simvolizmi bir-birindən tamamilə müstəqil olaraq, demək olar ki, bütün qitələrin xalqları arasında yaranmışdır. Eyni zamanda, yad məzmunlu əjdaha obrazının "mexaniki olaraq" bir mədəniyyətdən digərinə keçə bilməsi olduqca inanılmazdır. "Uzaq Şərq (Çin) ilə müsəlman dünyasının mədəni və tarixi mühitində əjdahanın məzmunu və simvolizmi arasında çox aydın fərq var."[1]

Qəbilə və ailə xalçalarının əjdaha motivi ədəbi deyil, xalq ənənəvi simvolizmini əks etdirir, folklor əjdahası isə qədim mif, əfsanə və xalq nağıllarına gedib çıxır. Adətən bu nağıllarda əjdaha nağıl qəhrəmanına məxsus dəbdəbəli sehrli sarayın və saysız-hesabsız daş-qaşın gözətçisi olur. Bu nağıllardakı əjdaha nağıl qəhrəmanın əjdahanın güc, sərvət və əbədi həyatı ehtiva edən keyfiyyətlərini mənimsəməsini simvollaşdırır. Beləliklə, ənənəvi inanclardakı "əjdaha" motivi sehrli bir bəxşişçi, xeyirxahlığın qoruyucusu və müdafiəçisidir. Xalq xalçalarındakı qədim heraldik əjdaha motivi Həyat ağacını/Həyat çiçəyini qoruyan mistik qoruyucu simvola çevrilmişdir.

Ənənəvi xalq xalçalarında əjdaha adətən obrazlı deyil, sxematik və ornamental üslubda stilizə olunur. O, xalçada əsas motiv kimi deyil, xalçanın əsas motivləri arasındakı boşluqlara "dolduran" sehrli çalarları olan kiçik talismanik simvol kimi mövcuddur. Qafqaz (Qarabağ) qrupunun xovsuz toxunuşlu məşhur Verni xalçaları istisna olmaqla, burada şaquli və üfüqi şəkildə təkrarlanır sxematik şəkildə təsvir edilmiş "**S**" şəkilli əjdaha əsas motivdir.

Məşhur təfsirdə ailənin sehrli qoruyucusu əjdaha pisliyi uzaqlaşdırır, uğur firavanlıq və uzunömürlülük gətirir. Bu xalçalarda əjdaha təsvirinə iki ikonoqrafik variantda rast gəlinir: 1. Müqəddəs həyat ağacını/çiçəyini qoruyan qoşalaşmış, heraldik əjdahaların təsvirləri; 2. "Əjdaha və Simurq" motivində əjdahaların təsviri.

Hər iki tipoloji qrupun ikonoqrafiyasının təhlili göstərir ki, xalq xalçaçıları əjdahanın təsviri ədəbi ənənəsi və onun saray ikonoqrafiyası ilə tanış deyildilər. Əjdaha obrazının saray kanonu yalnız saray xalçalarında olub, adi kənd toxucuları onu görmədiyi üçün öz xalçalarında təkrar etməyi düzgün hesab etməyiblər.

19-cu əsrin əvvəllərində Şimali Azərbaycan feodal xanlıqları Rusiya imperiyasına birləşdirildikdən və Cənubi Azərbaycan xanlıqları Fars imperiyasının tərkibində qaldıqdan sonra vəziyyət dəyişdi. Xalça istehsalı və xarici bazarda satışı ilə məşğul olan Rusiya İmperiyasının "Sənətkarlıq Komitəsi"nin Qafqaz bölməsi təşkilatının (1899-1924) fəaliyyəti dövründə ənənəvi Azərbaycan xalçaları geniş miqyasda kommersiyalaşdırılmış və onların dizaynında əjdahaların folklor təsvirlərinin itirilməsi baş vermişdir.

Rusiya imperiyasının süqutundan sonra xalça biznesinin idarə edilməsi və təşkili ilə Zaqafqaziya Dövlət Ticarət Birliyi - "ZAKQOSTORQ" (1924-1927) məşğul olmuşdur. Bundan

sonra - “Azərxalça” Elmi-Yaradıcılıq İstehsalat Birliyi (“AzərXalça”) (1927-ci ildən bu günə qədər. 2016-cı ildən “Azərxalça” Açıq Səhmdar Cəmiyyəti adlandırılıb).“Azərxalça” Açıq Səhmdar Cəmiyyətinin müasir xalçalarında əsas dizayndan asılı olmayaraq, bütün istehsal olunan xalçalarda folklor tipli əjdaha motivləri əvvəlki ənənəvi statusunu itirərək, tədricən xalçalardan yox oldular.

## NƏTİCƏ


Azərbaycan xalçalarının əksər qrup və növlərində əjdaha təsvirlərinə rast gəlinir və onların dizaynı Qarabağın “Əjdahalı” xalçalarındakı təsvirlərdən köklü şəkildə fərqlənirlər. Sadə toxucular tərəfindən toxunmuş belə əjdaha motivləri folklor düşüncədən qaynaqlanaraq, sadəlövh, bəzən isə - bayağı ikonoqrafiyaya malik idilər. Qarabağın “Əjdahalı” xalçalarında professional rəssamlar tərəfindən yaradılmış əjdaha təsvirlərindən fərqlənən belə folklor tipli əjdaha motivləri ənənəvi regional xalçaların dizayn “boşluqlarında” bəd nəzərdən qoruyan və evə, ailəyə xeyir-bərəkət gətirən magik motivlər kimi toxunmuşlar. Həmin əjdaha motivlərinin fərdi və subyektiv təsvirləri cehizlik və ailə xalçalarında daha çox toxunaraq, eyni zamanda, evi, ailəni bəd-nəzərdən qoruyan talisman funksiyasını yerinə yetirmişlər.

Ənənəvi ornamental xalçalarda toxunmuş əjdaha motivləri nə qədər tanınmaz, fantastik və sadəlövh görünsələr belə, onları “Müqəddəs Həyat Ağacının”(Çiçəyin) qoruyucuları qismində tanımaq olur. Xalçanın dizaynına əjdaha motivinin daxil edilməsi ikili məqsəd daşıyırdı: onlar, bir tərəfdən - dizaynın boşluqlarını dolduraraq, xalçanın bədii və maddi dəyərini artırırdılar, digər tərəfdən - xalçanın “gizli” talismanık gücünü artırırdılar.

Ənənəvi ornamental xalçalarda yalnız əjdaha təsvirləri deyil, eyni zamanda, həmin əjdahaların bəd qüvvələrdən qoruduqları “Həyat ağacı” motivi də ornamental stiizasiyaya uğrayaraq, naxışlaşmış simvolik ağac/gül obrazında təqdim edilmişdir.

## MƏNBƏLƏR


1. T. İbrahimov. CAUCASIAN DRAGON CARPET (about the history of the appearance of the motive "Dragon" in Caucasian carpets).
https://www.academia.edu/38330257/CAUCASIAN_DRAGON_CARPET_about_the_history_of_the_appearance_of_the_motive_Dragon_in_Caucasian_carpets_

2. D.Qədirova. “. Семантика орнаментов ковров «Малыбейли», Azərbaycan Xalçalrı, cild 6, N20, 2016.

3. T. İbrahimov. CAUCASIAN FLAT-WOVEN DRAGON CARPETS VERNI and ZILI.
https://www.academia.edu/45106400/CAUCASIAN_FLAT_WOVEN_DRAGON_CARPETS_VERNI_and_ZILI

4. T. İbrahimov. DRAGON CULT. MESOPOTAMIA - SOUTH CAUCASUS. TO THE QUESTION ABOUT SYMBOLISM OF THE «DRAGON MOTIF» IN THE CAUCASIAN CARPETS
https://www.academia.edu/41597390/DRAGON_CULT_MESOPOTAMIA_SOUTH_CAUCASUS_TO_THE_QUESTION_ABOUT_SYMBOLISM_OF_THE_DRAGON_MOTIF_IN_THE_CAUCASIAN_CARPETS

5. T. İbrahimov. DRAGON SECRET ON THE BATTLE BANNER OF ALEXANDER THE GREAT from the “dragon” carpets Caucasus to the dragon motifs of medieval Europe...
https://www.academia.edu/40464221/DRAGON_SECRET_ON_THE_BATTLE_BANNER_OF_ALEXANDER_THE_GREAT_from_the_dragon_carpets_Caucasus_to_the_dragon_motifs_of_medieval_Europe_
6. D. Qədirova. Qarabağin xovsuz xalilarinda əjdaha motivinin dizayn xüsusiyyətləri. Mədəniyyət dünyası. Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Unuversiteti, buraxılış XXXX. Bakı 2021.
7. T. İbrahimov. DRAGONS OF A TURKIC TOMBSTONE IN THE ARMENIAN VILLAGE OF NORATUS.
https://www.academia.edu/96665138/DRAGONS_OF_A_TURKIC_TOMBSTONE_IN_THE_ARMENIAN_VILLAGE_OF_NORATUS
8. D. Qədirova. Vərni xovsuz xalılarında əjdaha motivinin həndəsi transformasiyası. Azərbaycan Milli Elmlər Akademiyası, Filologiya və Sənətşünaslıq, 2022, №1, s. 224
9. Qərbi Azərbaycan folkloru, I cild, Bakı, “Elm və Təhsil”, 2023.
10. D. Qədirova. “Malıbəyli xalçalarının texnoloji xüsusiyyətləri”, təsviri və dekorativ-tətbiqi sənət məsələləri, №21, Bakı-2018.

**ILLUSTRATIONS**



# Caucasian
# Azerbaijan

## Karabakh
### Palace carpets



















## Caucasian, Karabakh (Azerbaijan) Malybeyli village

















## Caucasian, Azerbaijan Kazakh, Chaily carpet













## Kara-Koyunlu village

**Former Zangezur (Qeoycha Maqal – West Azerbaijan) - now Armenia.**
**Kazakh group of Azerbaijani carpets**







**Quba, Karakashly village**



**Caucasian**
**Azerbaijan**

**Shirvan Bijo**
**carpet**



















**Kazakh.**

**Dragons guarding the tree/flower of life**



## Motif Dragon and Phoenix



Quba,
Dragon Sumakh (Detail)



Quba,
pile carpet
(detail)



Shirvan,
Salyan





Karabakh





## Caucasian, Azerbaijan
## Shirvan, Qeshed village











# Caucasian, Azerbaijan
# Karabakh, Qoradiz carpets











**Ganja**

**S-shaped dragons of the grid/filter in which potential Evil will get stuck**



**Karabakh**

**Flat woven Verni carpet.
Dragons marching in a row -
an image of army protecting from Evil**



# Caucasian (Azerbaijan) Kilim dragons





Kazakh, Pile Carpet







Quba Kilims

